AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, № 3 (269), 10–29
https://dx.doi.org/10.48445/u2051-2917-0609-o

DİLÇİLİK MƏSƏLƏLƏRİ

# Müasir Azərbaycan dili leksikasının koqnitiv və linqvokulturoloji əsasları

***İsmayıl Kazımov***
Filologiya elmləri doktoru, professor. AMEA Nəsimi adına Dilçilik İnstitutu, Müasir Azərbaycan dili şöbəsi. Azərbaycan.
E-mail: prof.ismayil.kazimov@gmail.com
https://orcid.org/0000-0002-4470-8786

**XÜLASƏ**
Azərbaycan dilinin leksikası orta məktəblərin bütün siniflərində mətnin daxilində, eyni zamanda dil və nitq qaydalarının mənimsənilməsi prosesində öyrədilir. İndiyə qədər həmin lüğət tərkibinin leksik-qrammatik, struktur-semantik, nadir hallarda isə etimoloji xüsusiyyətləri haqqında şagirdlərə müfəssəl bilgilər verilmişdir. Bu proses, eyni zamanda ali məktəblərdə də tələbələrə bir qədər geniş istiqamətdə mənimsədilmişdir. Məqalədə müasir Azərbaycan dilinin lüğət tərkibi semantik-koqnitiv və linqvokulturoloji aspektlərdə təsvir olunur, konseptual məkanda söz və ifadələrə xas bir sıra özünəməxsus milli-kulturoloji xüsusiyyətlər, verballaşma qanunauyğunluqları meydana çıxır, azərbaycanlıların dünyabaxışında bir çox assosiativ obrazlar modelləşir. Müəyyənləşir ki, mədəniyyət anlayışı da sözlə ifadə olunur. Sözə məxsus hər bir fraqment dünyanın dil mənzərəsini əks etdirir. Tədqiqatda söz və ifadələr koqnitiv prosedur kimi öyrənilir. Məhz bu yazıda da, həmin məsələlər işıqlandırılır.

**AÇAR SÖZLƏR**
koqnitiv leksika, linqvokulturologiya, koqnitiv elmdə leksikologiya, mədəniyyət, dünyanın dil mənzərəsi

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 03.08.2021
qəbul edilib: 10.08.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Bilal Həsənli.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 3, VOL. 269, 10–29
https://dx.doi.org/10.48445/u2051-2917-0609-o

**LINGUISTIC ISSUES**

# Cognitive and linguocultural bases of modern Azerbaijani language lexicon

***Ismayil Kazimov***
Doctor of Philological Sciences, professor. Institute of Linguistics named after Nasimi of ANAS, department of Modern Azerbaijani language. Azerbaijan.
E-mail: prof.ismayil.kazimov@gmail.com
https://orcid.org/0000-0002-4470-8786

**ABSTRACT**
Vocabulary of the Azerbaijani language is taught in all grades of secondary schools within the text, as well as in the process of mastering the rules of language and speech. So far, students have been given detailed information about the lexical-grammatical, structural-semantic and in rare cases, etymological features of the vocabulary. This process has also been mastered by students in higher education. The article describes the vocabulary of the modern Azerbaijani language in semantic-cognitive and linguocultural aspects, a number of peculiar national-cultural features peculiar to words and expressions in the conceptual space, regularities of verbalization occur, many associative images are modeled in the worldview of Azer-baijanis. It turns out that the concept of culture is also expressed in words. In research, words and phrases are studied as a cognitive procedure. These issues are also covered in our article.

**KEYWORDS**
cognitive lexicon, linguoculturology, lexicology in cognitive science, culture, the language landscape of the world

**ARTICLE HISTORY**
Received: 03.08.2021
Accepted: 10.08.2021

## Giriş / Introduction

Leksikologiya sürətlə inkişaf edən dilçilik sahələrindən biridir. Bu elm dilin lüğət tərkibi haqqında geniş nəzəri biliklər sistemidir. Lüğət tərkibi deyərkən, dildə olan bütün sözlərin və frazeoloji birləşmələrin toplusu və sistemi nəzərdə tutulur. Lüğət tərkibi dil üçün zəruri “tikinti materialı”dır. Dilin digər sistemləri ilə müqayisədə o, daha çox dəyişikliyə məruz qalır.

“Tikinti materialı” sözdür. “Söz, ümumiyyətlə, dil sisteminin əsas, müstəqil və ayrıca işarə vahididir. Mənalandırılma və işarələndirilmə vəzifələrini daşıyan bu mərkəzi dil vahidi səslənmənin, mənanın və real varlığa münasibətin üzvi surətdə bir-birinə bağlılığı nəticəsində meydana çıxır. Leksikada maddi aləmin işarələnmiş inikası diqqət mərkəzində olur. Sözdə məhz üç cəhəti − səslənmə, məna və maddi aidiyyatı birlikdə götürdükdə, leksikologiya elminin sahələri, onların vəzifələri aydınlaşır” [17, s.100].

Göründüyü kimi, leksikologiyada sözün müxtəlif aspektləri tədqiq olunur.

“Dildə olan bütün sözlərin cəmi leksika adlanır” termin-tezisi də bu gün özünü doğrultmur. Çünki leksikologiyada söz ayrıca deyil, bir-biri ilə sıx şəkildə, paradiqmatik və sintaqmatik əlaqə və münasibətlərin fonunda öyrədilir.

“Leksika bu və ya başqa bir dildə sözlərin sadəcə toplusu yox, qarşılıqlı münasibət və əlaqəli faktların müəyyən sistemi olduğundan, leksikologiya ayrı-ayrı sözlər haqqında deyil, dilin bütövlükdə leksik sistemi haqqında elm kimi qarşımızda durmaqdadır” [17, s.4].

Dildə tarazlıq məsələsi öncə, leksikada müşahidə olunur. Leksika sahəsində baş verən dəyişmələr, yeniliklər sadəcə olaraq kəmiyyətlə hesablanmır, tədricən mikrosistem və makrosistem səviyyəli keyfiyyət dəyişmələri ilə də xarakterizə olunur. Leksikada bu proses aktı bir tərəfdən insanın dil mexanizminə uyğunlaşması zərurətindən irəli gəlirsə, başqa bir tərəfdən müəyyən meyillərin təsiri inkişafı səciyyələndirir. Bir sözlə, ümumi inkişaf qanunu dil vahidləri ilə dildən kənar olan qanunauyğunluqlar arasındakı əlaqəyə görə müəyyənləşir. Dilin leksikası birbaşa olaraq cəmiyyətdə baş verən ictimai-siyasi və mədəni dəyişikliklərlə, sosial təbəqələrin ətraf aləmi, dünyanın mənzərəsini dərketmə fəaliyyəti, milli şüuru ilə bağlı olur.

Biz yeni leksikologiya deyərkən, leksik vahidlərin koqnitiv mərhələdəki linqvokulturoloji əlamətlərini nəzərdə tuturuq. Yeni təhsil sistemində də öyrədilən məsələlərin necə dərkedilməsi, biliyə çevrilməsi məsələləri qoyulmuşdur. Hazırda leksikoloji tədqiqatlar leksik vahidləri köhnə qaydada tədris etməyin əhəmiyyətsiz

olduğunu göstərir. Günümüzdə şagird və tələbələrə sözün, dil vahidinin koqnitiv əsaslarını və onların milli-mədəni keyfiyyətlərinin öyrədilməsi tələb olunur. Öncəki leksikologiyalardan fərqli olaraq, sözügedən leksikologiya müasir Azərbaycan dilinin leksik sisteminin koqnitiv istiqamətdə aparılan araşdırmalarından ibarətdir.

Müasir Azərbaycan dilinin leksikoloji sistemi ilə tanışlıq həmin dilin müxtəlif həyati dərinliyini, leksik məna və onların tiplərini, struktur-semantik dərəcələrini, sözlərin müxtəlif növ diferensiyasiyası, onların mənşəyi ilə bağlı məsələni əhatə edir.

Digər başlıca məqsəd leksik-terminoloji vahidlərin məzmun və mahiyyətini, tərkibini, məna parametri və qruplarını, onların inkişaf qanunlarını müəyyən etməkdən ibarətdir.

Sözdə "düşüncənin bütün pillələrinə xidmət göstərmək bacarığı" var. Harada insan varsa, orada söz mövcuddur. Bu, sözün "qəribəliklərlə dolu olan xarakteri"dir. O, nitq prosesində konturlaşdırılmış düşüncələri ifadə edir. "Söz – düşüncənin reallaşdığı və insanlar üçün ən vacib kommunikasiya vasitəsi olan, öncədən hazırlanıb, nitq şəraitində tam və müstəqil biçimdə təkrarlana bilən leksik-qrammatik mənalı kiçik və sərbəst dil vahididir". O, dünyanın yeni möcüzəsidir. Tarixdə öncə söz meydana gəlmiş və o, Allahın özü olmuşdur.

Leksika müasir Azərbaycan dili üçün ən qiymətli sərvətdir. Bu qiymətli sərvətdə xalqın tarixi, etno-mədəni dəyərləri qorunub saxlanılmışdır. Xalqın mənşəyi, meydana gəlməsi, onun inkişafı, cəmiyyətdəki rolu, təbiəti və dünyanın dərki, ona necə yiyələnməsi, müxtəlif dil proseslərini doğuran səbəblər leksikada öz əksini bu və ya digər formada geniş dairədə tapır. Bu dəyərli sərvət − söz, dərketmənin əsas mənbəyidir. Hər hansı söz bilavasitə varlıqla, dünyanın mənzərəsi ilə bağlı olub, ətraf aləmdəki əşyanın, hadisənin, əlamət və prosesin, hərəkətin və s. adlandırılmasına xidmət edir. Dil üçün zəruri olan "tikinti materialları" sosial, siyasi, mədəni həyatda baş verən və baş verəcək dəyişikliklərlə − tarix boyu əldə olunan hər cür nailiyyətlərlə, əsaslı dönüşlərlə, müxtəlif sahələrin unikal inkişafı ilə, yeni-yeni təsərrüfat və mədəni sahələrin, elmi dünyagörüşün meydana gəlməsi ilə lüğət tərkibinə yeni rənglər, boyalar qatmışdır.

Son illərdə linqvistikanın yeni bir sahəsi − koqnitiv dilçilik formalaşmışdır. Koqnitiv linqvistikanın əsas istiqamətləri kulturologiya, linqvokulturologiya, məntiq, semantik-koqnitiv, fəlsəfi-semiotik sahələrdir. Onlardan biri də koqnitiv leksikologiya və semantikadır. Koqnitiv leksikologiya və semantika ünsiyyət üçün ən əlverişli dil vahidlərinin (sözlərin, ifadələrin və s.) "dərində olan" mənalarını müəyyənləşdirir. Əlbəttə, mənaları müəyyənləşən dil vahidləri ilə insan ətraf aləmlə əlaqə qura bilir. Burada məna ətraf aləmlə münasibətin təzahüründən, eləcə də onun yaddaşda

saxlanılmasından, şüurda dərk edilməsindən gedir. Leksikologiya və semantika elminin bu növündə dil formaları mental reprezentasiya vahidləri kimi götürülür, yalnız sözlə kifayətlənmir, başqa dil vahidləri də tədqiqata cəlb edilir. Həmin vahidlər kommunikasiya üçün əsas sayılan informasiyaları daşıyır və onların vasitəsilə insanla ətraf aləm arasında əlaqə yarada bilir. Koqnitiv leksikologiya və semantika bir sıra mühüm məsələlərə aydınlıq gətirir: Mənalar mental leksikonda necə həkk olunur? İnsan onları yaddaşdan götürüb necə aktivləşdirir? İnsanlar ətraf aləmlə necə bağlanır? Kontekst, situasiya və dünya bilgisi mənanın reallaşmasına necə təsir göstərir? [4, s.44].

**Dilin leksik sisteminin koqnitiv aspektləri**

Koqnitiv qrammatika termini dar və geniş mənada işlədilir. İlk növdə "koqnitiv" terminindən dilin qrammatik konsepsiyası və qrammatik modellərinin təsvirində istifadə olunur və bütün koqnitiv linqvistikaya istiqamətlənir. Müxtəlif dil hadisələri koqnitiv aspektdə də öyrənilir. Həmin hadisələr dünyanın dərketmə prosesi ilə əlaqəli şəkildə aydınlaşdırılır, bu cür koqnitiv fenomen, insanın biliyi, qavrayışı, diqqəti, yaddaşı, düşüncəsi və s. bir-birinə bağlı şəkildə tədqiq edilir. Dildə məlumatların doğulması, dərk edilməsi, kateqoriyalaşma prosesi, dünyanın konseptuallaşması, onun dildə inikası və ən başlıcası, biliyin, anlamanın bazası kimi predmetlər tədqiqat obyektinə çevrilir. Bu problemlərdən Rey Çekendoff, C.Lakoff, Ç.Fillomor, U.Çeyf və digər xarici ölkə alimlərinin əsərlərində bəhs edilmişdir.

Koqnitiv linqvistika müasir dilçiliyin fənlərarası əsas istiqamətlərindən biridir. Həmin linqvistika əsas etibarı ilə dil birliyinin mənimsənilməsi və tətbiq olunmasında əqli prosesləri araşdırır. Bu proseslər koqnitiv strategiyalara əsaslanmaqla öyrənilir. "Dil insanın koqnitiv, əqli (mental), neyroloji fəaliyyətinin əsas təzahürüdür" prinsipi burada əsas götürülür.

Bu termin ingilis dilində *"coqnitive"* – science, rus dilində isə – koqnitologiya və koqitologiya adlanır [17, 256 s.].

Koqnitiv linqvistikanın rəsmi olaraq meydana gəlməsi 1989-cu ildə Almaniyanın Duysburq şəhərində keçirilən Beynəlxalq linqvistik simpoziumda, eyni zamanda Birinci Beynəlxalq konfransda elan edilmiş və ondan istifadə uyğun görülmüşdür.

Dünya linqvistik-koqnitivləri sırasında Çarlz Fillomor, Corc Lakoff, Ronald Lanqaker, Aleksandr Kibrik, Leonard Talmin kimi alimlərin adları tanınır.

Koqnitiv linqvistikada dil və düşüncənin (təfəkkürün) mürəkkəb münasibətləri yeni mərhələdə araşdırılır. Koqnitiv linqvistika əsas dillə düşüncənin bir-biri ilə

əlaqəsi məsələsini yenidən gündəmə daxil edir. Burada düşüncə qeyri-verbal əlamətə malikdir. Dil düşüncənin varlıq forması kimi deyil, insanın təfəkkür prosesinin təzahürü kimi çıxış edir, bu da, konsept vasitəsi ilə əməliyyat prosesidir. Bu problematik məsələ ilə ilk zamanlar neyrofizioloqlar, həkimlər, psixoloqlar, sonrakı mərhələlərdə isə psixolinqvistlər və b. məşğul olmağa başlamışlar.

Beləliklə, koqnitiv linqvistika müasir linqvistika elminin müstəqil sahəsi kimi formalaşıb fəaliyyət göstərməkdədir. Dildə baş verən koqnitiv proseslər, mental (əqli) tiplər və s. bu elmin başlıca sahələri kimi diqqət mərkəzindədir.

Müasir koqnitiv linqvistikanın xüsusiyyətlərinə aşağıdakılar aid edilir: koqnitiv linqvistikanın mənbələri; əsas anlayışları (konseptuallaşma, kateqoriyalaşma, konsept, koqnisiya və s.); konseptin təyini, onun strukturu, növləri; funksional leksikologiyanın predmeti, məqsəd və vəzifələri, əsas istiqamətləri; antroposentrik istiqamət və funksional leksikologiya; funksional leksikologiyanın mətnisentrik istiqamətləri; funksional leksikologiyaya yeni yanaşma; dildə şəxsiyyətin leksik prezentasiyası və mətni fəaliyyəti; koqnitiv-praqmatik aspekt; söz və konseptin mətndə təhlili problemi; sözün kommunikativ potensialı və onun mətndə əksi; mətnin linqvistik strukturu və onların növləri; bədii konseptlərin leksik vasitələrinin reprezentasiyası; bədii konseptin mətni assosiativ sahəsi; sözün kommunikativ və koqnitiv imkanlarının metodik aspektdə öyrənilməsi; bədii mətnin konseptual strukturunun təhlili; dünyanın poetik mənzərəsi və bədii konsept anlayışı; bədii konseptin növləri; mətnin konseptual strukturu və onun leksik və dərketmə strukturu ilə əlaqəsi.

İnsan biliyi və bilik səviyyəsinin sistemi necə qurulmuşdur, hansı formalarda və mexanizmlərlə işləyir? Bütün bunları və varlıq simvollarının dəyişmələrinə dair fakt, hadisə və duyğuların yaratdığı biliklərin dərketmə proseslərinin təfəkkürdə əks olunmasını günümüzdə koqnitiv linqvistika öyrənir. Dil vasitəsilə insan beynində əks olunan bilik sisteminin alt və üst səviyyələri ilə qruplaşdırılması və kateqoriyalaşdırılması koqnitiv linqvistikanın araşdırma prinsiplərinin cəmi kimi dərk edilir.

Dilçi-alim F.Veysəlli yazır: “Hər bir elm sahəsinin öz vahidi olmalıdır. Koqnitiv linqvistikanın da ən kiçik vahidi konseptdir. Koqnitiv dilçiliyi maraqlandıran məsələlərdən ən vacibi insanın öz aləmini dildə ifadə etməsi bacarığıdır” [17, s.6].

Leksik vahidin koqnitiv mənalarını insan ünsiyyət prosesində aktivləşdirir. Başqa sözlə, insanlar mənaları başa düşməklə ətraf aləmlə birbaşa bağlanır. Mənanın gerçəkləşməsinə kontekst (məna kontekstdən asılı olaraq dəqiqlik tapır), situasiya (müəyyən söyləmin işləndiyi kontekst, nitq şəraiti və s.) və dünya elmi təsir göstərir.

Koqnitiv leksikologiyada, öncə Azərbaycan dili leksikasının milli-mədəni spesifikası öyrənilir.

Deməк, müasir Azərbaycan dili leksikasının başlıca xüsusiyyətlərindən biri də onun milli-mədəni keyfiyyətləridir. Bu keyfiyyətlərə malik olan leksika millətin varlığını, mövcudluğunu şərtləndirir. Belə şərtləndirmənin bazasını linqvokulturologiya elmi təşkil edir. Sözə linqvo-mədəni aspektdə yanaşmaq, dünyanın dil xəritəsi (dil mənzərəsi) baxımından, leksik vahidləri öyrənmək linqvokulturologiya elminin qarşısında duran ümdə vəzifələrdəndir.

Qeyd edək ki, dilimizin zəngin leksikası kompleks biçimdə linqvokulturoloji istiqamətdə öyrənilməmişdir. Müasir Azərbaycan dili leksikasının özünəməxsus linqvokulturoloji aspektləri mövcuddur. Bu aspektlərə aşağıdakılar aiddir:

*Dil və mədəniyyət, dünyanın dil mənzərəsi anlayışı, həmin mənzərənin dilin leksika və frazeologiyasında inikası (güzgü), milli-mədəni şüur, milli-mədəni spesifika, linqvomədəni konseptlər, milli-mədəni özünəməxsusluğun Azərbaycan dili leksika və frazeologiyasına aid olan leksikoqrafik işlərdə təsviri* və s.

Linqvokulturologiya elmi dildən mədəniyyətə, mədəniyyətdən dilə aşırıdır, növbələşmədir. O, müstəqil elm sahəsidir. Bu elmin üç dayaq nöqtəsi vardır: *"dil-mədəniyyət-insan"*. Belə bir üçlük də mövcuddur: *"dil-dərketmə-mədəniyyət"* [17, s.8].

**"**Dünyanın dil mənzərəsi" anlayışı ideyası Aleksandr fon Humboldta məxsusdur. "Dünyanın konseptual xəritəsi" anlayışı da bu xüsusda yaranmışdır. Bu xəritə yalnız predmetləri əks etdirmir, həm də insan münasibətlərini özündə birləşdirir. Dünyanın dil xəritəsi konkret milli dil mənzərəsini əks etdirir. İnsanın müşahidələri nəticəsində *"günəş doğur"*, "*yağış yağır"* söyləmləri meydana çıxır.

A.fon Humboldt yazır: "İnsan düşünür, yalnız dildə yaşayır, ətraf aləmi duyur" [6, s.237].

Linqvokulturologiyada başlıca termin − "anlayış" konseptdir. Konsept − təsəvvürdür. Onun növlərindən biri də linqvomədəni konseptdir. Linqvomədəni konsept "mədəniyyət", "etnos", "dil" anlayışlarını ehtiva edir.

Beləliklə, "linqvokulturologiyanın" əsasında duran başlıca ideya mədəniyyətin dil vasitəsi ilə öyrənilməsidir" [12, s.208].

Sözə linqvokulturoloji cəhətdən yanaşma həm də antroposentrikdir. Söz vasitəsilə insan dünyanı, ətraf aləmi dərk edir. Sözə məxsus fraqmentlər (əsas hissələr, parçalar) onu xüsusi linqvokulturoloji istiqamətdə öyrənir. Sözdə mədəniyyət anlayışı ifadə olunur. Mədəniyyət anlayışı deyərkən, müxtəlif konseptlər və onların tipləri nəzərdə tutulur. Bu konseptlər milli konnotasiyaları yaradır. Məs:

Azərbaycan mədəniyyətində *“ev”* konsepti anlayışı *“yuva”, “yurd”, “ev-ocaq”* anlayışları ilə sıx şəkildə bağlıdır. Milli rəngarənglik həmin sözün linqvospesifikasını − insanın yaşam yerini aydınlaşdırır: İsti *yuvasından* məhrum olmaq. Zəhra *yuvası* dağılmış yavruların, analarını itirmiş bu üç qızın halını, ürək parçalayan səmimi göz yaşlarını görərək ixtiyarsız gözləri yaşardı [S.Hüseyn]; Üç dəfə qaçmışam qarlı Sibirdən; Bizim meşələrdə salmışam *yuva* [S.Vurğun].

Dilimizdə “yuva salmaq” ifadəsində də linqvospesifika mövcuddur. Yurd salmaq, məskən salmaq, yaşamaq üçün şərait yaratmaq:

Məni xilas etdin vaxtsız ölümdən,
O gündən *qəlbimdə yuva saldın* sən
[S.Vurğun].

Azərbaycan dili leksikasının linqvokulturoloji xüsusiyyətləri *söz və kontekst* arasındakı sərhədləri müəyyənləşdirir. Kontekst − söz mühiti, sözün düşdüyü mühit ona dürüst məna verir. Söz nə qədər çoxmənalı olursa, kontekstdə, nitq prosesində, dialoq şəraitində o, tamamilə müəyyən məna daşıyır. Bəzi hallarda dil vahidinin semantikası “söz konteksti” ilə yox, “gerçək kontekst” ilə müəyyən edilir. Həmin “gerçək kontekst” birdəfəlik situasiyanı inikas etdirdikdə, bu zaman sözün işləkliyindən, funksional imkanlarından bəhs etmək lazım gəlir. Linqvokulturoloji əlamət ən çox metaforik kontekstlərdə özünü göstərir. Məsələn: *Millətin pullarını quzğunlar dimdiyində mənimsəyirlər*. Burada sözlər metaforik kontekstdə qərarlaşmışdır.

Sözlər leksik konseptlər təşkil edir. Müasir Azərbaycan dilində leksik konseptlər (söz-konseptlər) baza konseptləridir, mənalarına görə milli-mədəni fenomen yarada bilirlər. Bu konseptlər bir tərəfdən dünyanın dil mənzərəsinin universal əlamətlərini göstərir, digər tərəfdən isə hər bir xalqın və dilin milli spesifikasını əks etdirir. Leksik konseptlər (söz-konseptlər) çoxölçülü olur, mürəkkəb konseptlər nüvə və periferiyalara bölünür, örtülü sistem təşkil edir, konseptə məxsus köhnə əlamətlər məna baxımdan yenilənir.

Söz-konseptlər dünyanın dil mənzərəsinin əsas vahididir. Müasir linqvistikada aktiv şəkildə dil və söz millətin mədəni kodu, kommunikasiya və dərketmənin silahıdır. Bu gün çoxları razılaşır ki, dilin antroposentrik ideyaları bir sıra cəmiyyət məsələlərinin həlli üçün gərəklidir. Bu xüsusda XXI əsrin əvvəllərində antropoloji linqvistik paradiqmalar meydana gəldi, tədqiqat obyekti kimi idrak, dərketmə subyekt seçildi. Beləliklə, insan dil sferasında, dil-insan problemləri təhlil olunmağa başladı.

Dildə antroposentrik ideyalar müasir linqvistikada əsas etibarilə dilin semantik

sistemində ortaya çıxdı. Bu ideyalar yayıldıqca, necə deyərlər, mənəvi-praktik fəaliyyət insanla, dillə sıx əlaqədə inkişaf edir. Leksikologiya da koqnitiv istiqamətdə inkişaf etdi, yeni sima yarandı və koqnitiv leksikologiya dilçilikdə yeni istiqamət aldı. Onun məqsəd və vəzifəsi dilin leksik-semantik sisteminin bütün sahələrində əks olunmasıdır.

Koqnitiv leksikologiyada söz yenidən nəzərdən keçirilir, qiymətləndirilir, mənalandırılır və insanlar tərəfindən fərqli şəkildə dərk edilir.

Bir məsələni də qeyd edək ki, XIX əsrdə psixologiya və linqvistika elmlərinin sərhədləri “balanslaşır”, dilin məzmun və mahiyyəti antropoloji nöqteyi-nəzərdən aydınlaşdırılmağa başlanır. Dilin kateqorial vasitələri insana məxsus kateqorial vasitələr − psixika, təfəkkür (düşüncə) və qavrama kimi mühüm vasitələrlə birləşir.

Koqnitiv elm dil, şüur, idrak və dərketmə münasibətlərini bir problem kimi öyrənir, dünyanın, ətraf aləmin konseptuallaşmasında və kateqoriyalaşmasında dilin rolunu, dərketmə prosesində insan cəmiyyətinin təcrübəsini, təsəvvür vasitələrinin formalarını və bir-birinə qarşılıqlı təsirini diqqət mərkəzində saxlayır.

Kateqoriyalaşma adı altında dərketmənin nizama, qaydaya salınması, yeni idrakın paylaşdırılması prosesi nəzərdə tutulur. Konseptuallaşma elə bir prosesdir ki, sözün koqnitiv əlamətlərinin toplamı müəyyənləşdirilir (o cümlədən kateqorial əlamətlərin). Beləliklə, dil təfəkkür vasitəsi kimi təqdim olunur. Bu prosesdə insan təcrübəsi, onun düşüncəsi fiksiyalaşır, dil − şüur mexanizmi, işarələr sistemi kimi, spesifik kodifikasiya və informasiyanı transformasiya edən vasitəyə çevrilir. Beləliklə, koqnitiv linqvistikanın obyekti dilin dərketmə mexanizmi kimi olmasıdır.

Müasir koqnitiv elmdə koqnitiv leksikologiyanın özünəməxsus yeri vardır. Koqnitiv leksikologiya nisbətən sözü müstəqil sahə kimi, koqnitiv linqvistikanın arqumentlərindən (sübut və dəlillərindən) istifadə etməklə ümumiləşdirir, stimul və reaksiya termin-anlayışlarından tədqiqatlarda istifadə edir [Алефиренко Н.Ф. Москва, 2005].

Burada əsas məsələ, “dünya reallıqları”nın konseptuallaşmasıdır. Konseptuallaşma müxtəlif səviyyələrdə dil vasitələrinin köməyilə həyata keçirilir [Краснодар, 2008].

Belə ki, dil işarələri fiziki reallıqları təyin etmir, söz universal (nadir) xüsusiyyətləri ilə metaforik mental işarələri də fəallaşdırır, sözdə olan mental əlamətlər dərk olunaraq modelləşir və sözə məxsus yeni reallıqlar meydana gəlir.

Fiziki reallıq dilin leksikası ilə sıx şəkildə bağlıdır. Yəni dilin lüğət tərkibində fiziki reallıq əhatə olunaraq qorunur. Mühüm problem olan konseptuallaşma məhz dilin leksikası ilə fiziki reallıq arasında baş verir. Leksika da dünya və dünya

reallıqları ilə bilavasitə əlaqədədir. "Leksik kateqoriyalar dünyanın ontologiyasını və onun nəticəsi olan insanın dərketməsini inikas etdirir: konkret predmetlər, hadisələr, onların xarakteristikası və kateqoriyaları təbii obyektlərdə kateqoriyalaşır" [6, s.42].

Söz konseptuallaşan məqamda izolyasiya olunur, bu zaman konseptual nüvənin mənası saxlanılır.

İsim bir nitq hissəsi kimi verbal konseptuallaşma sırasında xüsusi yeri tutaraq, xüsusi konseptolma statusuna malikdir. O, polifunksional semantik potensiala sahib nitq hissəsidir, konkret situasiyalarla ifadəsini tapır. İsim vasitəsilə mətnin adını müəyyənləşdirir, mətnlərdə açar sözləri formalaşdırır, mətnin əsas məzmun və mahiyyətini proqnozlaşdırır.

Bu kardinallıq feilə də aiddir. Dilin leksik sistemi, leksikanı təşkil edən vasitələr müxtəlif cəmiyyətin dünyagörüşünü inikas etdirir. Bütün dil vahidləri leksik səviyyədə dünyanı bütöv şəkildə əks etdirir, insan söz vasitəsilə dünyada doğulur, aləmi bəzəyir, irəli çıxır. İnsana aid predmetlərin leksik vahidlərlə əlaqəsi, onun mədəni-tarixi təcrübəsi leksikada əsas forma kimi obyektivləşir, yəni təcəssüm və ifadə olunur, eləcə də dərk olunur. Əgər leksika gerçəkliyi konseptuallaşdırırsa, həmin obyektlər arasında əlaqə və münasibətlər preroqativ qrammatikada bərpa edilir. Əgər leksika dil vahidlərinin koqnitiv-nominativ funksiyasını əks etdirirsə, qrammatika koqnitiv diskursiv planda inkişaf edir. Həm leksik, həm də qrammatik konseptlər ətraf mühiti, şəraiti interpretasiya etmək gücünə malikdir, insanın qavrama qabiliyyətini öz forma və məzmunu ilə nümayiş etdirir.

Beləliklə, koqnitiv leksikologiya üçün fərqli cəhət sözü yeni predmet kimi koqnitiv elmin çərçivəsində postulatlaşdırır və yeni prosedur və ya instrumental, metodoloji, şüur və dərketmə cəhətdən qanuni hala salır, yoluna qoyur, dəyişir və evristik tədqiqat metoduna əsaslanır.

Koqnitiv leksikologiya "yeni gerçəkliyi", sözün yeni leksik-semantik xüsusiyyətlərini üzə çıxarır və bunları ənənəvi leksikologiyadan fərqli olan yeni metodlar vasitəsi ilə interpretasiya edir.

Sözün qarşısında linqvodidaktik perspektivlər açılır. Linqvodidaktik perspektivlər dedikdə, lüğət tərkibinin idrakla əlaqədar xüsusiyyətləri və bu istiqamətdə kompleks və çoxaspektli cəhətləri nəzərdən keçirilir. Belə ki, söz həyatla, məktəb və təlimlə əlaqəli öyrənilir. Sözün məzmun və mahiyyətinin aydın dərk olunması, eyni zamanda müəyyən situasiya ilə bağlı, eləcə də sözdən təfəkkürün və fəaliyyətin aləti kimi istifadə olunur. Sözdəki fikrə yeni yanaşma və bu yöndə sözün öyrənilməsi yeni şüur və dərketmə, şübhəsiz, yeni problem yaradır. Söz yeni və fərqli mənada təsəvvür edilir, təqdim olunur, onun linqvokoqnitiv əsasları, resursları yeni vasitələrlə əhatə

olunur, yeni təyinatını alır, yeni sərhədlərini cızır. Sözün yeni növbəti qavranması prosesi baş qaldırır, yeni həqiqi qiyməti axtarılır.

Koqnitiv elmdə leksikologiyanın yeni ideyaları doğulur. Sözə yeni yanaşma ilə təzə innovasiyalar təyin edilir, dilin təbiəti və funksiyaları obyekt olaraq araşdırılır. Hər şeydən əvvəl, dilin leksika ilə əlaqədar koqnitiv funksiyası müzakirə olunur. Bir tərəfdən leksik vahidlərdə gerçəklik vasitələri əks olunur, digər tərəfdən isə dilin semantik vasitələri hərəkətə gəlir, şərh olunur və mövcud qavramı qoruyub saxlayır.

Beləliklə, koqnitivizm və leksikoloqiya elə tədqiqat strategiyası hesab olunur ki, müraciət olunan və öyrənilən leksik vasitələr və məhsullar sistemli şəkildə informasiyaları emal edir. Qorunub saxlanılan informasiya mobilizasiya (səfərbər) olunur.

Klassik leksikologiyada dilin lüğət tərkibinin formalaşması, sözlərin tarixi dəyişməsi, leksik mənşəcə sistemləşmə, layların istifadə olunma sferaları, aktivləşmə dərəcələri, sintaqmatik-paradiqmatik təşkili məsələləri əsas etibarı ilə nəzərdən keçirilir. Koqnitiv leksikologiyanın mərkəzində isə konsept və idrak, fikrin qarşılıqlı münasibəti dayanır. Söz və anlayışın əlaqəsi, münasibəti müəyyənləşir. Forma və mahiyyət (məna və idrak) qarşılaşdırılır, fərqli məqamlar ortaya çıxır.

Beləliklə, koqnitiv leksikologiya bir elm kimi, leksikologiyanın yeni bir növü olaraq dilin lüğət tərkibinin qarşılıqlı təsir prosesini və insanın mental leksikonu, koqnitiv struktur sistemi kimi başa düşülür. Bu, koqnitiv leksikologiyanın əsas definisiyasıdır (yəni tərifidir).

Dilin lüğət tərkibində mental leksikon anlayışı linqvistik idrak və işıqlı zona təşkil edir. Söz, demək olar ki, burada koqnitiv vahid olaraq fəaliyyət göstərir.

Sözün mental elementləri müxtəlif vahidlərdən ibarətdir: *konsept, freym, qeştalt, ssenari, fikir xəritəsi, sxemlər* və s.

Konsept dominant vahid sayılır. Qeştalt həm psixoloji, həm də fəlsəfi termin-anlayışdır. İ.Olşanski 3 qeştalt növünü müəyyənləşdirmişdir: *dil, fikir, perseptual* [14, s.306].

Konsept koqnitiv substrat və onun semantik strukturudur.

Nəhayət, koqnitiv leksikologiya üçün qanadlı işarələrin, ifadələrin koqnitiv strukturu maraqlıdır, bu cəhətdən dil aktiv dərketmə vasitələrini obyektivləşdirir.

Koqnitiv leksikologiyanın nəzəri prinsipləri haqqında nə demək olar? XXI yüzildə koqnitiv leksikologiyanın siması bir-birinə yaxın, heç zaman bir-birinin əksi olmayan iki paradiqmanı təyin edir: *koqnitiv-kulturoloji və kommunikativ-praqmatik*.

Leksikologiyanın koqnitiv elmlərlə aydın əlaqəsi mövcuddur. Koqnitiv leksikologiya ümumi leksikologiyanın bir qolu kimi, dilin lüğət tərkibinin diqqət mərkəzində yerləşir, dilin universal koqnitiv vasitələri ilə koqnitiv instrument (alət) −

qanadlı işarələr sistemi, kodlaşmada (reprezentasiyada) və dərketmənin şərhində mühüm rol oynayır. Bu sistem digər semiotik vasitələrdən fərqlənir, insan üçün eyni zamanda daxili və xarici obyekt mental leksikom bazasında və s. formalaşır [Кубрякова Е.С. Москва, 2004].

Ona görə də dilin strukturu səviyyəsində leksik vahidlər, sözlər açar rolunu oynayır, dünya mənzərəsi insan psixikasında açılır, dünyanın dil mənzərəsi bütöv olaraq yaranır.

Dilin lüğət tərkibinin linqvokoqnitiv təhlili insan nitqinin leksik komponentlərinin başa düşülməsinin, mental leksikonunun, nitq təcrübəsinin, leksik vahidlərdən əlverişli istifadənin, nitqyaradıcı fəaliyyətinin necəliyinə imkan yaradır.

Koqnitiv leksikologiyanın əsas xarakterik xüsusiyyətləri spesifik vahid kimi mental leksikanın əsas qayda və prinsiplərinin nizamlanmasıdır. Buraya aşağıdakılar aiddir:

- ✓ mental leksikonun strukturu;
- ✓ mental leksikonun semantikası;
- ✓ onun təsvirinin metod və modelləri;
- ✓ leksik mənalar arasında münasibət və koqnitiv struktur (anlayış, konsept, freym və s.);
- ✓ insanın mental leksikasında inkorporlaşan yeni vahidlərin vasitə və üsulları və s.

Beləliklə, koqnitiv leksikologiya gerçəkliyin kateqoriyalaşma və konseptuallaşmasının leksik-semantik mexanizminə olan diqqətini bir yerə cəmləşdirərək dünyanın dil xəritəsini modelləşdirir.

Koqnitiv leksikologiyada digər bir məsələ idrakın leksik-semantik prinsipinin reprezentasiyasıdır.

Əgər koqnitiv leksikologiya dil və dərketmənin qarşılıqlı münasibəti problemini bütövlükdə əhatə edirsə, o zaman semantika və psixolinqvistika əsas hissə kimi qavranılır. Koqnitiv leksikologiyada semantika və psixolinqvistika nəinki hadisə, eləcə də dərketmə sferası kimi öyrənilir.

Koqnitiv leksikologiya dilin leksik potensialını, leksik zənginliyini üzə çıxarır, qlobal proses olan kateqoriyalaşmanın müxtəlif perseptual, yaxud konseptual dərkini nümayiş etdirir. "Koqnitiv leksikologiya üçün xüsusi psixolinqvistik xüsusiyyət, xüsusi leksik-semantik metodlarla lüğət tərkibinin dinamik qanunauyğunluğunu, sinxron inkişafın və diaxron təkamülün dilin semantik məkanında əks etdirməkdir" [Сорокин. Ю.А. Москва, 2018].

**Koqnitiv leksikologiya və psixolinqvistikada:**

- ✓ təbii dildə söz yaradıcılığı prosesi və sözü dərketmənin modelləri tədqiq olunur;
- ✓ leksik kateqoriyalaşmanın prinsipləri tədqiq olunur;
- ✓ insanın ətraf aləmi dərketməsi və dilin lüğət tərkibinin material bazası tədqiq olunur;
- ✓ metaforlaşma və metonimyalaşma proseslərinin linqvokoqnitiv əlamətləri öyrənilir [Одинцова И.В, 2018].

Koqnitiv leksikologiya psixolinqvistik metodların köməyindən istifadə edir, elmlərarası və xüsusi semasioloji əlaqə yaradır. Sözün sintaqmatika və paradiqmasında həmçinin koqnitiv leksikologiya əks olunur. Koqnitiv leksikologiyada başqa bir məsələ "fikri dəyərləndirmə" prinsipidir. Bu baxımdan, koqnitiv leksikologiyada antroposentrik əlaqənin təbiəti belədir: "Linqvokulturologiya insanı dəqiq *orentirovka* edir, mədəni amil dildə, dil amili isə insanda formalaşır" [Телия В.Н. Москва, 1999].

Dilin leksik yarımsistemi mədəniyyətin güzgüsüdür, hansı ki, o, yalnız real dünyanı əks etdirmir, həm də insanı əhatə edir, təkcə insanın real şəraiti ilə əlaqədar deyil, xalqın ümumi dərketmə, onun mentaliteti, milli-mənəvi xarakteri, obraz həyatı, adət-ənənəsi, dəyər sistemi, dünyagörüşü və dünyaya baxışı ilə əhatə olunub. Ona görə də fikir mədəniyyəti ancaq bir vasitə kimi dilin lüğət tərkibini öyrənməklə özünü göstərir. Bu baxımdan, leksika mədəniyyətin tərkib hissəsi, onun aləti və bizim mənəvi gerçəkliyimizdir. Bu gerçəklikdə özünəməxsus milli mentalitet cəhətlər mövcuddur. Həmin cəhətdən dildə mədəni kod, spesifik linqvokultur, müxtəlif mədəniyyətlərarası kommunikasiya formaları bir amil kimi yaranmışdır. Müxtəlif mədəniyyətlərarası kommunikasiya universallıqdan, semantik primitiv toplusu bazasından asılı vəziyyətdədir.

Koqnitiv leksikologiya çərçivəsində demək olar ki, sözlə mədəniyyət arasında unikal və qarşılıqlı əlaqə üzə çıxır: söz-bədən, cisim. Söz − ellinist anlayış, can isə fəaliyyətdir. Sözün ellinist fəaliyyəti tarixən də əks etdirilmişdir. Mədəniyyət dindir, hər xalqın esensiyası, dərketmə mahiyyətidir. Dil isə mədəniyyəti qidalandırır.

Koqnitiv leksikologiyada başqa bir prinsip kimi diskursiv-kommunikativ prinsip qeyd olunur. Koqnitiv leksikologiyanın diskursla əlaqəsi sözün leksik-semantik mənalarının qarşılıqlı münasibəti ilə şərtlənir, bununla bağlı meydana çıxır. Birincisi, söz diskursla birbaşa bağlıdır, hər şeydən əvvəl, leksik vahidlər diskursda kommunikativ struktur təşkil edir. Leksik vahidlər söyləm və mətnə çevrilərək həmin vəzifəni yerinə yetirirlər. Diskurs şəraitində dialoqlar söz vasitəsi ilə sualdan cavaba

keçir, replikalar inkişaf edir. Diskurs bu cəhətdən dialoq nitqini, replikaları sözün manipulyasiya alətinə çevirir.

Koqnitiv leksikologiya üçün semantika da mühüm faktor sayılır. Koqnitiv semantika terminoloji vahidinə iki rakursdan yanaşılır: Amerika alimlərinin yanaşması ilə Rusiya dilçilərinin, psixoloqlarının baxışı fərqlidir. R.Lanqakeranın fikrincə, koqnitiv qrammatika, leksikologiya deyərkən elə koqnitiv semantika başa düşülür.

Koqnitiv leksikologiyada sözün məzmun və ifadə planı iki ənənə əsasında inkişaf edir. Bunlar kompleks onomosioloji təhlillər vasitəsi ilə, onomosioloji semantik sahədə real assosiasiyalar (şüurda ayrı-ayrı təsəvvürlər arasında əlaqə) doğurur. Dilin ümumi onomosioloji təhlil nəzəriyyəsində koqnitiv yanaşma planı müxtəlif sahə leksikologiyasına istinadən müəyyənləşir:

- ✓ *tarixi leksikologiya*: burada sözün nominativ (adlandırma) dinamikası, sözün məntiqi cəhətdən formalaşması öyrənilir;
- ✓ *areal leksikologiya:* burada ədəbi dil və dialektlər arasında olan obyekt və variantlaşmaların koqnitiv səbəbləri öyrənilir;
- ✓ *dilin, onun leksikologiya bölməsinin sinxron tədqiqi* (sinonim sıranın və semantik sahənin koqnitiv əsasları) ortaya çıxır;
- ✓ *müqayisəli leksikologiyanın müxtəlif dillər üzrə konseptlərinin ifadə vasitələri öyrənilir;*
- ✓ *tətbiqi dilçilik, o cümlədən lüğətçilik* (ideoqrafik lüğətlərin tərtibinin koqnitiv əsasları) və linqvodidaktika araşdırılır.

Koqnitiv yanaşma dilin qrammatik və leksik təsvirinin xüsusi bir tipi kimi özünü göstərir. Koqnitiv qrammatika və leksikada yalnız üç tip baza strukturu ayrılır:

1) simvolik struktur;
2) semantik struktur;
3) fonoloji struktur.

Bu strukturlar bir-birilə assosiativ əlaqədədir.

Qeyd edək ki, hər hansı bir konsept tipinin məzmunu, mənası şəxsin dünyanın bu və ya başqa fraqmenti haqqında bildiyi, ehtimal etdiyi, fikirləşdiyi, təsəvvür etdiyi informasiya və məlumatdır.

Konsept inkişafın son həddi və sözün semantik doldurulmasının son nöqtəsidir [Колесов В.В, 1992].

Nümunələrə nəzər salaq:

*"Demokratiya"* (yun. demokratia) – "*demos*" xalq, "*kratos*" ölkə; demokratiya ulduzu, demokratiya carçısı, demokratik idarə üsulu, demokratiyanın həyata

keçirilməsi, demokratlaşdırılmış cəmiyyət, demokratik obraz, demokrativ həyat və s.

Kontekstdə *ulduz* sözünün metaforik mənaları. Poetik mətnlərdə: *qütb ulduzu, axan ulduz*; Günəş, məşhur sima, ədəbiyyatımızın günəşi; öz bəxtinə (taleyinə) inanmaq; dəniz ulduzu (bağırsaqboşluqlu heyvan), Yer ulduzu (Sərdar Əsədin kitabının adı); milçək tutmaq (avara adam haqqında); axşamadək, ulduzlar görünənədək; xoşbəxt doğulmaq…bir ulduz şölələnir və s.

Düşüncədə "ulduz". Ulduz oldum. Qlobal kontekstdə: "ulduz ölkələr"; kommunikativ kontekstdə: "mənim ulduz həyatım" [R.Komara].

Üçlük – *"konsept", "məna", "düşüncə*" lüğət tərkibinin koqnitiv məzmununu bir daha ifadə edir.

*Mentalitet, mentallıq*. Müasir dövrdə bu anlayış − terminoloji vahidlər müxtəlif vasitələrlə şərh olunur: "milli xarakter", "psixoloji tip", "milli psixomədəniyyət", "mənəvi fəaliyyət stereotipi".

Latın mənşəli "mentallıq", "mentalitet" başqa dillərdə: alman dilində − mentalitat, ingilis dilində − mentality, fransız dilində − mentalite biçimlərində istifadə olunur. *"Ментальность – это способ видение мира. Менталитет – совокупность специфических когнитивных, мотивных и поведенческих стереотипов этноса".*

"Mentallıq" və "mentalitet" leksik vahidləri − fenomeni kulturologiyada diferensiasiya olunur. Kulturologiyaya dair lüğətdə bu anlayış – leksik vahidlərin sinonim mənaları belə göstərilmişdir: *"Общий духовный настрой, относительно целостно совокупность мыслей, верований, привичек, духа, который создает картину мира а скриплет единство культурной традиции или какого-нибудь сообщества"* [8, s.271].

Dilin lüğət tərkibi dünyanın dil mənzərəsini əks etdirir. Bu baxımdan, dilin lüğət tərkibinin konseptsfera ilə möhkəm əlaqəsi vardır. Yəni dilin lüğət tərkibinin strukturu dünyanın etnodil mənzərəsini əks etdirir, konseptsferadakı informasiyaları müxtəlif sahələr üzrə kodlaşdırır. Koqnitiv leksikologiya leksik mənada olan mental substratları kvalifikasiya edir, dil işarəsinin informasiya mahiyyətini formalaşdırır.

Dil işarəsinin informasiya məzmunu çoxsəviyyəli struktura malikdir. Məsələn: *"Kosmos"* sözünün etnodil xüsusiyyətləri: Qədim yunan mənşəli söz *"kosmeo"* feilindən yaranmışdır. Latın dilində sinonimi *mundus* sözüdür. Bu termin vasitəsilə müxtəlif konnotasiyalar yaranmışdır: *kosmik fantaziya, kosmik obrazlıq, müəllifin poetik kosmosu, yeni kosmik raketlər* və s.

Başqa bir konsept: "*tale"* sözü linqvokulturoloji konseptdir. *Tale* mikrosahə yaradan konseptlərdəndir. Mürəkkəb çoxobrazlı struktura malikdir. Bu konseptin se-

mantik-koqnitiv təsviri özünəxas bir sıra milli-kulturoloji xüsusiyyətləri üzə çıxarır. Azərbaycanlıların dünyabaxışında "bəxt, səadət, tale, xoşbəxtlik" bir sıra assosiativ obraz modelləri üzrə verballaşır: bəxt insanın öz əlindədir; tale hədiyyədir; tale subyekt kimidir.

Frazeoloji sferaya aid konseptual məkanda tale: taleyi ilə barışmaq, taleyinə təpik atmaq, taleyi ilə oynamaq. Göründüyü kimi, tale və onun sinonimləri Azərbaycan dilində metaforik resurslarla zəngin və güclüdür.

Qeyd edək ki, leksika mətnyaradıcı prosesdə fəal iştirak edir.

*"Zaman"* konsepti bu funksiyanı fəal yerinə yetirir. Zamanın konseptləşməsi insanın şüuru, həyatın başa düşülməsi, tarix və mədəniyyət hadisələri ilə əlaqədardır. Hər bir cəmiyyətdə zaman təsəvvürü müəyyən mədəni çalarlar qazanır. Zaman universal konseptlərdəndir. Bu konseptin verballaşmasına bədii diskurslarda çox rast gəlmək olur. Məsələn: Mətnə diqqət edək: Yaxşı, mən yatdım. Gecə keçir. Sən də uzan. Ay doğanda gedərik [İ.Şıxlı. Dəli Kür]. Bu mətndə zaman təsəvvürünü iki metaforik söyləm – gecə keçir və ay doğanda gerçəkləşdirmişdir. Bunun nəticəsində zaman kontinumunun bazasında bədii diskurs məkanı əmələ gəlir.

Müasir linqvistikada əsas istiqamət iki paradiqmanın − koqnitiv linqvistika və linqvokulturologiyanın qarşılıqlı bağlılığını öyrənməkdir. Linqvokulturologiyanın məhsulu linqvistikada antroposentrik paradiqmalardır. Koqnitiv linqvistikanın açar anlayışı informasiya anlayışıdır, insanın dərketməsində reprezentasiya olunur.

Linqvokulturologiya dili mədəniyyət faktoru kimi öyrənir. Dilin milli prizması, milli mentalitetin xüsusi ifadə vasitələri bu faktora daxildir.

Sözün fraqmentləri sözü xüsusi linqvokulturoloji istiqamətdə öyrənir. Məsələn, *"İşıq"* konsepti anlayışı. Sözün leksik mənası: Ətrafı işıqlandıraraq, onu gözlə görünəcək hala salan şüa enerjisi; nur, ziya; işıq almaq, işıq vermək − işıqlandırmaq: Ay doğdu işıq verdi; işıq olmaq, işıq salmaq, işıq saçmaq, işıq düşmək; metoforikləşmiş anlamda: ağ gün, aydınlıq, xoşbəxtlik; fərəh mənasında: Azərbaycan kəndinə əbədi işıq və səadət gəlmişdir; maarif, mədəniyyət, ürfan, tərəqqi mənasında: İşıq, nur mənbəyi gözəl yurdumuz, Getdiyin yollara nurlar səpələr [N.Rəfibəyli]; İşıqdan qorxan, maarif düşməni, tərəqqi düşməni, cəhalətpərəst. İşıqdan qorxan və millətin ayılmağından xof və əndişə edən mülkədar, bəylərin və ağaların mərhəmətindən (kənd camaatı) bir növ əxlaqsız olublar [F.Köçərli]; aydınlıq, təmizlik mənasında: Dağlar başı işıqdır, Gün dağa yaraşıqdır, Qaynanam məni sevmir, Oğlu mənə aşıqdır [Azərbaycan dilinin izahlı lüğəti. II cild. Bakı, 1980].

Tanınmış şair Hüseyn Kürdoğlunun poeziyasında *"işıq"* açar konseptlərdəndir. Aşağıda verilən bir neçə bəndə diqqət yetirək:

**Xırman işığı**

Qalıb xatirimdə körpəliyimdən,
Ağ pencə, ağ taya, xırman işığı.
Vəllərin üstündə fırlandıqca mən,
Düşürdü gözümə heşan işığı,
Dirilik şöləsi – xırman işığı!

Qocalar, qarılar, qızlar gəlinlər,
İşdən soyumurdu qaş qaralınca.
Əldə qabar vardı, alındasa tər,
Gün qızğın gəlirdi günün dalınca,
İş üstdə gur olur insan işığı,
İnsan işığıydı xırman işığı!

Zülmət su calasa bir gün oduma,
Tutulsa günəşim, tutulsa ayım,
O xırman işığı yetər dadıma,
Dünya işığından kəsilməz payım.
Sönməz sığındığım aman işığı,
O xırman işığı, xırman işığı
[3, s.83-84].

*“Həyat”* konsepti. “*Həyat arabası”*. Mənalar sistemində eyni sözün hərfi mənadan məcazi mənaya keçməsi dildə ümumi ilə tək arasında olan üzvi əlaqə sayəsində asanlıqla formalaşır. “*Həyat arabası”* ifadəsini hər birimiz məcazi mənada dərk edirik, heç kəs bu zaman adi araba barədə fikirləşmir, amma yenə də arabanın metaforik mənası ilə hərfi mənası arasında əlaqə olduğu şübhəsizdir: Həyatının məsud çağları; Saçlarını ağardan yarım əsrlik bir həyat idi [S.Hüseyn], Açıb qarşısında külliyyatını, Öyrənir şairin o, həyatını! [S.Vurğun], coşqun həyat, həyat eşqi, elmin həyatla əlaqəsi; O vicdan qızının ehtişamı var; Qəlbə həyat verir gülümsəyərək [S.Vurğun]; yoxsul həyat, həyata qaytarmaq, həyatla vidalaşmaq və s.

Beləliklə, müasir koqnitiv araşdırmalar öncə insana, kommunikasiya prosesində iştirakçıların qarşılıqlı dərk etməsinə xidmət göstərən dildaxili və dilxarici amilləri özündə birləşdirən konsept anlayışının vacibliyinin müxtəlif sferalarına artan maraqla sıx əlaqədardır.

## Nəticə / Conclusion

Beləliklə, dilçiliyin leksikanı öyrədən bölməsi − leksikologiya dilin söz varlığını, söz mənzərəsini əks etdirir. Leksikologiyanın yeni bir sahəsi koqnitiv leksikologiya adlanır. Bu leksikologiya akademik səviyyədə Azərbaycan dili leksik vahidləri üzrə öyrənilməmişdir.

Koqnitiv leksikologiyanın meydana gəlməsi sözə iki yeni baxışı formalaşdırmışdır:

1) funksional-kommunikativ;
2) diskursiv-koqnitiv.

Lüğət tərkibinin sistem şəkli insanı əhatə edən obyektiv aləmdə predmet və hadisələr arasında əlaqənin dildə, həmçinin insan düşüncəsinin sistemə salınma fəaliyyətinin məhsuludur.

Dilin lüğət tərkibi leksik-semantik məkanda kifayət qədər funksional sistem yaradır.

Diskursiv-koqnitiv ənənə nəinki leksik-semantik hadisələri təsvir edir, həm də dilin leksik vahidlərini adekvat kommunikativ-praqmatik cəhətdən interpretasiya edir. Tədqiqatlar göstərir ki, leksikologiyada bu yeni sahənin yaranmasını bir sıra prinsiplər şərtləndirmişdir:

1) antroposentrizm prinsipi;
2) dərketmənin leksik-semantik reprezentasiya prinsipi;
3) fikri dəyərləndirmə prinsipi;
4) diskursiv-kommunikativ prinsip.

Burada başlıca məsələ sözün koqnitiv semantika nəzəriyyəsinin yaranmasıdır. Buraya daxildir: çoxvektorlu koqnitiv onomasiologiyanın müəyyənləşdirilməsi; koqnitiv leksikologiyanın əsas kateqoriyaları arasında (sözün mənası və dərk edilməsi); koqnitiv-diskursiv korrelyasiyanın (qarşılığın) əldə edilməsi; lüğət tərkibinin struktur izomorfizm və dilin konseptsferası. Bu cür yanaşmalarla semantik məkanda mühüm linqvodidaktik ideyalar Azərbaycan dilinin lüğət tərkibinin konseptsferadakı qarşılıqlı əlaqələrini və məzmununu, başqa sözlə, koqnitiv leksikologiya problemlərini reallaşdıra bilər.

Əgər ənənəvi leksikologiyada söz və onun mənasına, sözün qarşılıqlı münasibəti sisteminə baxılırsa, sintaksisdə sözün cümlə və mətnlə əlaqəsinə, koqnitiv leksikologiya və koqnitiv sintaksisdə isə anlayış və onun təsviri, dildə dərketmənin əks olunması, dil işarə kimi, qavrama, dünyanı mənimsəmə aləti kimi, "ekstralinqvistik gerçəklik" kimi diqqət mərkəzində dayanır. Koqnitiv leksikologiyada kateqoriya-

laşma xüsusiyyəti dil kateqoriyalarının dərketmə formatı (ölçüsü) kimi çıxış etməsi ilə bağlıdır.

Beləliklə, "koqnitiv leksikologiya" mövzusu müasir Azərbaycan dilçiliyində yeni perspektivlərə yol aça bilir.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Azərbaycan dilinin izahlı lüğəti. II cild. (1980). Professor Ə.Orucovun redaktəsi altında. Bakı, Elm nəşriyyatı, s.457-458.
2. Ələkbərov A. (1978). Leksikologiya. Müasir Azərbaycan dili, I cild. Bakı, Elm. 322 s.
3. Kürdoğlu H. (2011). Seçilmiş əsərləri, iki cilddə, I cild. Bakı, Sabah, s.83-84.
4. Veysəlli F. (2015). Koqnitiv dilçilik: əsas anlayışları və perspektivləri. Bakı, Mütərcim, s.6.
5. Алефиренко Н.Ф. (2005). Когнитивная лексикология русского языка. М.: Изд-во Гнозис.
6. Болдырев Н.Н. Процессы концептуализации и категоризации в языке и роль в них имен абстрактной семантики. Горизонты современной лингвистики: Традиции и новаторство.
7. Гумбольдт В.фон. (1985). Язык и философия культуры. М.: Прогресс. 448 с.
8. Кармин А.С. (1997). Основы культурологии. Морфологии культуры. Москва.
9. Колесов В.В. (1992). Концепт культуры: образ-понятие-символ. Вестник Ленинградского университета, 2\3, 16.
10. Концептуализация как процесс и его результаты: национально-культурные и индивидуально-авторские особенности. (2008). Краснодар.
11. Кубрякова Е.С. (2004). Язык и знание: На пути получения знаний о языке: Части речи с когнитивной точки зрения. Роль языка в познания мира. М.: Изд-во Языки славянской культуры.
12. Маслова В.А. (2001). Лингвокультурология. М.: Академия. 194 с.
13. Одинцова И.В. (2018). Когнитивная лексикология и когнитивный синтаксис в лингводидактке. Мир русского слова. Языкознание.
14. Ольшанский И.Г. (1999). Лингвокультурология: Методологические основания и базовые понятие. Язык и культура. № 2. Москва.
15. Скребйова Т.Г. (2011). Когнитивная лингвистика. Курс лекцей. СПб.:

Филологический факультет СПбГУ.
16. Сорокин Ю.А. (1989). Марковина И.Ю. Национально-культурная специфика художественного текста. Москва.
17. Шанский Н.М. (1964). Лексикология современного русского языка. Москва.
18. Телия В.Н. (1999). Русская фразеология. Семантический, прагматический и лингвокультурологический аспекты. Москва, с.94-97.